# UŞAQLARINIZ SİZƏ BIR ƏMANƏTDİR

Yaradıb nizamlayan və yol göstərən ALLAH`a həmd olsun! Saysız nemətləri üçün Ona həmd edirəm! Şəhadət edirəm ki, ALLAH`-dan başqa ibadətə və itaətə layiq haqq ilah yoxdur. Axirətdə və dünyada həmd Onadır! Şəhadət edirəm ki, Peyğəmbərimiz Muhəmməd ﷺ Onun qulu və razı olduğu elçisidir. ALLAH`ım!.. Qulun və Rəsulun Muhəmməd Mustafaya, əhli-beytinə və əshabına, onlara uyan və nümunə alanlara xeyir-dua və salam elə, onları bərəkətli et!..

Bundan sonra... Ey müsəlmanlar!.. ALLAH`-dan layiqincə qorxun və Ona itaətə bağlı qalın! Çünki Ona itaət etmək ən doğru və ən güclü davranışdır. Azuqə hazırlayın, şübhəsiz azuqənin ən xeyirlisi ALLAH`dan layiqincə qorxmaqdır.

ALLAH`ın qulları!.. ALLAH`ın ﷻ insanlar üzərindəki neməti sayıla bilinməyəcəq qədər çoxdur. ALLAH ﷻ belə buyurur:

***"Əgər ALLAH`ın nemətlərini sayacaq olsanız, sayıb qurtara bilməzsiniz. Həqiqətən, ALLAH Bağışlayandır, Mərhəmətlidir!"***[1]

Bu nemətlərin ən böyüklərindən biri də nəsil nemətidir. ALLAH ﷻ belə buyurur:

***"ALLAH sizin üçün özünüzdən (****Adəm və Həvvadan, yaxud öz cinsinizdən****) zövcələr yaratdı, zövcələrinizdən də sizin üçün oğullar, nəvələr əmələ gətirdi, pak (****halal****) nemətlərindən sizə ruzi verdi..."***[2]

Nəsil, bəşəriyyətin davamı və valideynlər üçün digər bir ömür olması ALLAH`ın ﷻ bir lütfüdür. ALLAH ﷻ belə buyurur:

***"Sizi yer üzünün varisləri edən (****bir-birinizin yerinə gətirən****) Odur..."***[3]

---

1 ən-Nəhl surəsi, 16/18.

2 ən-Nəhl surəsi, 16/72.

3 əl-Fatir surəsi, 35/39.

Uşaqlar, valideynlərinin xüsusiyyətlərini və xasiyyətlərini daşıyırlar. Dünya olduqca onlar ilə ALLAH`a ﷻ ibadət gerçəkləşir və yer üzü abad edilir. Onların sayəsində yardımlaşma, bir-birinə mərhəmət etmə, qohumluq əlaqələri və yaxşılıq qurulur. ALLAH ﷻ belə buyurur:

***"Ey insanlar! Sizi tək bir şəxsdən** (Adəmdən) **xəlq edən, ondan zövcəsini** (Həvvanı) **yaradan və onlardan da bir çox kişi və qadınlar törədən RƏBB`inizdən qorxun!** (Adı ilə) **bir-birinizdən** (cürbəcür şeylər) **istədiyiniz ALLAH`dan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, ALLAH sizin üzərinizdə gözətçidir!"***[4]

ALLAH ﷻ belə buyurur:

***"İnsanları sudan** (nütfədən) **yaradan, onları** (bir-biri ilə) **əsl qohum** (qan qohumu) **və***

---

4 ən-Nisa surəsi, 4/1.

***sonradan qohum edən Odur. RƏBB`in (*hər şeyə*) Qadirdir!"***[5]

Uşaqlar, ALLAH`ın ﷻ bir neməti olduğu kimi eyni zaman da valideynlər üçün böyük bir əmanətdir. Əmanətin haqqı, qorunmaq və itirilməməkdir. Mühafizə edilmək və pozulmamaqdır. Əmanəti qorumaq və ondan qafil olmamaqdır. ALLAH ﷻ belə buyurur:

***"ALLAH sizə əmanətləri öz sahiblərinə qaytarmanızı və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etmənizi əmr edir…"***[6]

Uşaqlar; dinləri və əxlaqlarının təmizlənməsi, sağlam üslubla tərbiyə edilmələrində valideynlərin və vəlilərin yanında bir əmanətdirlər. ALLAH ﷻ belə buyurur:

---

5 əl-Furqan surəsi, 25/54.
6 ən-Nisa surəsi. 4/58.

***"Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar (***_daşdan düzəlmiş bütlər_***), xidmətçiləri isə ALLAH`ın onlara verdiyi əmrlərə asi olmayan, buyurduqlarını yerinə yetirən daş qəlbli*** _(heç kəsə zərrəcə rəhm etməyən)_ ***və çox sərt təbiətli mələklərdir (***_zəbanilərdir_***)."***[7]

Yəni; ALLAH`a ﷻ itaət edərək və Ona ﷻ qarşı asi olmağı tərk edərək cəhənnəmlə aranıza bir maneə qoyun! Amr ibn Şuayb رضي الله عنه atasından, o da babasından Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Uşaqlarınıza yeddi yaşında namazı əmr edin, on yaşında namaz üçün onları döyün və yataqlarını ayırın."*[8]

---

7 ət-Təhrim surəsi, 66/6.
8 Əbu Davud.

Uşaq namazdan məsul olmasa da, ibadətə öyrəşməsi, ibadət etməyə davam edərkən və günahlardan çəkinərkən həddi-buluğ yaşına girməsi üçün yeddi yaşında namaz qılması əmr edilir. Bunu əmr etməklə məsul olan vəlidir. Bu yaşda ona bunu əmr etməsə günahı vəlinin üzərinədir. Oruc da eyni şəkildədir, həddi-buluğdan əvvəl uşaq oruc tutmağa öyrəşdirilməlidir.

Din və əxlaq mövzusunda xüsusi diqqət göstərmək valideynlərin ən mühüm vəzifəsidir. Çünki uşaq, dininə bağlı olaraq böyüyərsə gəncliyində bütün haqları qoruyar. Dini, qohumları və cəmiyyəti qarşısındaki vəzifələrini yerinə yetirər. ALLAH`ın ﷻ haqlarını yerinə yetirməsə, qulların haqlarını heç yerinə yetirməz. Gözəl əxlaqa öyrəşmək, nəfsdə sağlam bir xasiyyət əmələ qətirər və bu xasiyyət xarici təsirlərlə yox olmaz. Eyni şəkildə pis sifətlərə öyrəşmək, hər cür alçaqlığa və pisliyə, ziyana və xəsarətə sürükləyər. Çünki

insan gəncliyini hansı işlə keçirərsə o işlə də qocalar. Hansı işlə qocalarsa o işlə də ölər. Hansı işlə ölərsə də –ALLAH`ın ﷻ izni ilə- o işlə yenidən dirildilir.

Uşaqların dini yönləri ilə maraqlanmaq, onlarla əlaqəli ən böyük şəri vəzifədir. Buna görə ALLAH ﷻ, qullarına hər zaman doğru dinə sarılmağı tövsiyə etmişdir. ALLAH ﷻ belə buyurur:

***"Ey iman gətirənlər! ALLAH`dan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda (müsəlman kimi) ölün!"***[9]

Bu tövsiyə, peyğəmbərlərin də tövsiyəsi idi. ALLAH ﷻ belə buyurur:

***"İbrahim və (****sonra da****) Yaqub bunu (****müsəlman olmağı****) öz oğlanlarına vəsiyyət edib (****hər biri dedi****): "Ey oğlanlarım, həqiqətən, ALLAH sizin üçün (****belə bir****) din (****İslam dini****) seçdi, siz də ancaq müsəlman olaraq ölməlisiniz!" (****Ey yəhu-***

---

9 Ali İmran surəsi, 3/102.

*dilər!)* ***Yoxsa Yaqubun ölümü yetişdikdə siz onun yanında idiniz?! O: "Məndən sonra nəyə ibadət edəcəksiniz?" - deyə oğlanlarından soruşduğu zaman, onlar: "Sənin ALLAH`ına və ataların - İbrahimin, İsmailin və İshaqın ALLAH`ı olan tək ALLAH`a təslim olacağıq (****Ona ibadət edəcəyik****)!"- dedilər."***[10]

ALLAH عز وجل Loğmandan عليه السلام bəhs edərək belə buyurur:

***"Oğlum! Namaz qıl, (****insanlara****) yaxşı işlər görməyi əmr et, pis işləri qadağan elə! (****Bu yolda****) sənə üz verəcək müsibətlərə döz! Həqiqətən, bu (****dediklərim****) vacib əməllərdəndir!"***[11]

İbn Abbas رضي الله عنه, Rəsulullahın صلى الله عليه وسلم belə buyurduğunu rəvayət edir:

*"Ey uşaq! Sənə bəzi kəlimələr öyrədəcəyəm: ALLAH`ı (dinini) qoru ki, O da səni qoru-*

---

10 əl-Bəqərə surəsi, 2/132-133.
11 Loğman surəsi, 31/17.

*sun! ALLAH`ı (dinini) qoru ki, Onu qarşında tapasan. İstədiyində ALLAH`dan istə və yardım dilədiyində ALLAH`dan dilə!"*[12]

Atalar, analar və vəlilər öyüdlərinin və yönləndirmə-lərinin fayda verməsi üçün özləri mütləq gözəl bir örnək olmalıdırlar. Çünki valideynlərin gözəl örnək olması, uşağın davranışlarına təsir edən ən böyük səbəbdir. Yaxşı və ya pis meyvələr verir. Buna görə müsəlman; ALLAH`ın ﷻ, boynuna qoyduğu əmanətlər haqda ALLAH`dan ﷻ qorxmalıdır. ALLAH ﷻ möminlər haqqında belə buyurur:

***"O möminlər ki, əmanətlərini və əhdlərini qoruyub saxlayarlar (****onlara tapşırılmış əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər****)."***[13]

---

12 ət-Tirmizi.

13 əl-Muminun surəsi, 23/8.

Uşaqların tərbiyəsi atalara, analara və vəlilərə əmanətdir. Ən çox lazım olan elm isə, heç kimin bilməməsinin bağışlanmayacağı şəri elmdir. Bundan sonra, istedadlarına, güclərinə və tərbiyələrinə görə digər elmlərə yönləndirilirlər. Hərkəs, yaradılışına uyğun şeydə müvəffəq olur. Yetişməkdə olan bir uşaq, dünyası və axirəti üçün ən uyğun şeyə yönəldilir.

Valideynlərə və vəlilərə əmr edilən bir vəzifə də uşaqlarla zərərli təsirlərin arasına girmək və onları pis dostlardan uzaqlaşdırmaqdır. Çünki pis dost, mütləq gerçəkləşəcək bir həlak və çirkin bir biabırçılıq deməkdir. Onları gözəl dostlarla və təmiz bir tərbiyə mühiti ilə əhatə etməlidirlər. Rəsulullah ﷺ belə buyurmuşdur: *"Gözəl dost, ətir daşıyıcı kimidir."* Valideynlər, uşaqları batil düşüncələrə sahib zərərli kitablardan, pis jurnallardan və pozğun filmlərdən uzaq tutmalıdırlar. Çünki bu təsirlər, qəlbləri ifsad edər və əxlaqları pozar. Gəncləri, şəhvət hərisi, əxlaq və

tərbiyə baxımından azmış bir hala gətirər. Uşaqlar, böyük olsalar belə, nəzarət və rəhbərlik ilə əhatə edilməlidirlər. Çünki bu, saleh insanların davranışıdır.

Şəriət baxımından qorunması vacib olan vəziyyətlərdən biri də valideynlərin –öpmədə belə olsa- uşaqlar arasında ədalətli olmalarıdır. Uşaqlarından bir qismini digərlərinə, oğlan uşaqlarını qız uşaqlarından üstün tutmamalıdırlar. Rəsulullah ﷺ belə buyurur:

*"ALLAH`dan layiqincə qorxun və uşaqlarınız arasında ədalətli davranın!"*

Atalara və analara düşən digər bir vəzifə də, uşaqlarına qarşı səbirli olmaqdır. Onları bağışlamaq və haram olmayan şeylərdə onlara anlayış göstərməkdir. Çünki bu, onların xeyri üçün daha uyğundur. ALLAH`ın ﷻ bağışlamasına səbəbdir. Çünki kim bağışla-

yarsa ALLAH ﷻ da onu bağışlayar. ALLAH ﷻ belə buyurur:

*"**Ey iman gətirənlər! Şübhəsiz ki, zövcələrinizdən və övladınızdan sizə düşmən olanlar vardır.** (Onlar din və ya dünya işlərində sizin əleyhinizə çıxar, sizi ibadətdən, yaxşı əməllərdən yayındırarlar). **Onlardan özünüzü gözləyin! Amma** (tövbə edəcəkləri təqdirdə) **onları əfv etsəniz,** (təqsirlərindən) **keçsəniz və bağışlasanız** (daha yaxşı olar). **Çünki ALLAH** (günahları çox) **Bağışlayandır, Mərhəmətlidir!**"*[14]

Burada zikr edilən düşmənçilik, insanın dini pozmasına yol açan şeylərdir. ALLAH ﷻ əfv etməyi və bağışlamağı əmr etmiş, bağışlayan və xoş münasibətlə davrananı bağışlamağı sözü vermişdir.

Valideynlər, uşaqlarına bəddua etməkdən çəkinsinlər! Çünki bu, onların daima

---

14 ət-Təğabun surəsi, 64/14.

bədbəxt olmasına səbəb ola bilər. Cabir رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Özünüzə, uşaqlarınıza, xidmətçilərinizə və mallarınıza bəd dua etməyin."*[15]

Şəriətin təlimatlarını yerinə yetirən, ilahi əmrlərə tabe olan, ALLAH`ın عز وجل müvəffəq etməsinə və təqdirinə uyan şəxs üçün uşaqlar, göz aydınlığıdır. O uşaqlar, ALLAH`ın عز وجل və qulların haqlarını yerinə yetirirlər. Onların doğru yolda olmalarının bərəkəti ana-atalarına dünyada və öldüktən sonra da çatar. ALLAH عز وجل, Onun əhdini yerinə yetirənlər haqqında belə buyurur:

***"Özlərinin, həmçinin əməlisaleh ataları, zövcələri və övladlarının daxil olacaqları Ədn cənnətləri gözləyir. Mələklər də hər bir qapıdan (****cənnət qapılarından****) daxil olub (****onlara****): "(****Dünyada ALLAH yolunda bütün*

15 Muslim.

*çətinliklərə)* ***səbr etdiyinizə görə sizə salam olsun! Axirət yurdu (****Cənnət****) nə gözəldir!" - deyəcəklər."***[16]

***"İman gətirib övladları imanla arxalarınca gedənlərin nəsillərini də (****Cənnətdə****) özlərinə qoşacağıq. Onların əməllərindən heç bir şey əskiltməyəcəyik. Hər kəs öz əməlinin girovudur!"***[17]

İnsan, şəriətin təlimatlarını pozarsa uşaq onun əleyhinə bir şərr olar. Azmasının günahı və günahının uğursuzluğu ona da çatar. Buna görə, uşaqlarınız haqda ALLAH`-dan ﷻ qorxun ey müsəlmanlar!..

ALLAH`a həmd olsun! Ona həmd edir, Ondan yardım və hidayət diləyirik! Nəfslərimizin şərindən və pis əməllərimizdən ALLAH`a sığınırıq! ALLAH kimi hidayətə

---

16 ər-Rad surəsi, 13/23-24.
17 ət-Tur surəsi, 52/21.

çatdırarsa heç kim onu azdıra bilməz. Kimi də azdırarsa heç kim onu hidayətə çatdıra bilməz. Şəhadət edirəm ki, ALLAH`dan başqa ibadətə və itaətə layiq haqq ilah yoxdur. O, Təkdir və şəriki yoxdur. Şəhadət edirəm ki, Peyğəmbərimiz Muhəmməd ﷺ Onun qulu və Rəsuludur. ALLAH`ım! Qulun və Rəsulun Muhəmmədə, əhli-beytinə, əshabına xeyir-dua və salam elə, onları bərəkətli et!..

Bundan sonra... Ey müsəlmanlar!.. ALLAH`dan layiqincə qorxun və Ona itaət edin! Onun qəzəbindən çəkinin və Ona asi olmayın! Bilin ki, uşaqlarınız və ALLAH`ın vəlayətini sizə verdiyi şəxslər boynunuzda bir əmanətdir. Onları ən doğru işlərə yönəltmək, onları hər cür gözəl əxlaqa və doğru yola yönləndirmək sizin məsuliyyətinizdir. Onları, nəzarətsiz qalmaqdan, pis dostlardan, boş vaxtın zərərlərindən, diqqətsiz və məsuliyyətsiz yola çıxmaqdan çəkindirin. Gecə və gündüz həyatlarını nizamlamada onlara yar-

dım edin! Xüsusilə gecəyə qədər küçələrdə boş-boş gəzməkdən onları uzaqlaşdırın! Çünki bu, gənci gələcəkdə özünü qurtara bilməyəcəyi işlərə apara bilər. Peşmançılığın fayda verməyə-cəyi bir yerdə əldə etdiyi pis xasiyyətlər üçün peşman ola bilər. Gənclər üçün ən təhlükəli şey, narkotikdən istifadə etmək və əxlaqi azmalardır. Onları daima bundan çəkindirin! Uşaqlarınız üçün faydalı və mübah vasitələr hazırlayın! Onları, faydalı əməllərə yönləndirin! Çünki siz, onlara görə hesaba çəkiləcəksiniz.

İbn Ömərdən ﵄ rəvayət edilən bir hədisdə, Rəsulullah ﷺ belə buyurur:

*"Hamınız bir çobansınız və hamınız əmri altında olanlardan məsuliyyət daşıyırsınız. Kişi, ev xalqının çobanıdır və onlardan məsuldur. Qadın, ərinin evinin çobanıdır və ondan məsuldur. Xidmətçi, sahibinin malının çobanıdır və ondan mə-*

*suldur. Hamınız bir çobansınız və hamınız əmri altındakılardan məsuliyyət daşıyırsınız."*[18]

ALLAH ﷻ belə buyurur:

***"Ey iman gətirənlər! ALLAH`dan qorxun və doğru söz söyləyin!*** (*Əgər belə etsəniz, ALLAH*) ***əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs ALLAH`a və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə*** (*Cənnətə*) ***nail olar."***[19]

ALLAH`ın qulları!.. İnsanların ən xeyirlisinə xeyir-dua və salam edin. Çünki bunu sizə ALLAH ﷻ əmr etmişdir. O ﷻ belə buyurur:

***"Həqiqətən, ALLAH və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər*** (*xeyir-dua verirlər*)***. Ey iman gətirənlər! Siz də ona sala-***

---

18 əl-Buxari, Muslim.

19 əl-Əhzab surəsi, 33/70-71.

***vat göndərib (****onun üçün salavat deyib****) layi-qincə salamlayın!"***[20]

***Əli ibn Abdu`r-RAHMAN əl-HUZEYFİ***
***19/03/1423 Hicri – 31/05/2002 Miladi***

---

20 əl-Əhzab surəsi, 33/56.